**Telman İbrahimov**
sənətşünas, Azərbaycan Milli Elmlər Akademiyasının
aparıcı elmi işçisi

# AZƏRBAYCAN MUZEYLƏRİNDƏ EKSPONATLARIN SAXLANMASINA NƏZARƏT EDƏN MÜSTƏQİL QURUM VARMI ?

Hamıya məlumdur ki, muzey sərvətləri nə muzeyin şəxsi əmlakı, nə tabeliyində olan nazirliyin, nə də - hökumət əmlakı deyil. Muzey fondunun yeganə hüquqi yiyəsi - xalqdır. Xalq özünün tarixi, bədii, maddi, mənəvi sərvətlərini hökumətə, onun tərkibindəki nazirliyə və həmin nazirliyin tabeliyində olan muzeyə əmanət edərkən, onların gələcək nəsillərə çatdırılmasını nəzərdə tutur.

Muzeylər formal olaraq bunu bilir. Lakin, praktika göstərir ki, bəzi muzeylər tədricən bunu yaddan çıxararaq, nümayiş olıunan eksponatları muzeyin şəxsi əmlakı, muzeiyin özünü isə - şəxsi təsərrüfat kimi idarə etməyə başlayırlar. Bu geniş yayılmış muzey xəstəliyidir.

Dünyada muzeylərin öz məsuliyyət statusunu yaddan çıxarmaması üçün muzeylər yanında ictimai nəzarəti və muzeyə icma dəstəyini təmin edən “Qəyyumlar Şurası” fəaliyyət göstərir(Попечительский Совет/Trustees and Museum Advisory Boards). Belə Şuralar muzey fəaliyyətində ictimai mənafeyin qorunmasını, eksponatların öyrənilməsi və təbliği siyasətinin müəyyən edilməsi və cəmiyyətin sərvətlər üzərində nəzarətin təmin edilməsində bilavasitə iştirak edirlər. Muzeyin Qəyyumlar Şurası adətən ianəçilərdən, mütəxəssislərdən, şəhərin hörmətli və inanılmış vətəndaşlarından seçilərək, nə muzey rəhbərliyinə, nə nazirliyə, nə də - hökumətə bilavasitə tabe olmurlar. Onlar muzeylə müştərək Əsasnamə əsasında, ictimai əsasıarla fəaliyyət göstərərək, vaxtaşırı cəmiyyət qarşısında muzey fəaliyyəti barədə hesabatlarını açıqlayırlar.

Muzeylərin praktikasında bəzən elə olur ki, qeyri-professional, səhlənkar muzey fəaliyyəti nəticəsində eksponat ciddi zədə alaraq, və ya yarıtmaz saxlanma şəraiti nəticəsində qüsurlara məruz qalır, orijinal görkəmini itirir. Belə halda, həmin muzey rəhbərliyi, tabe olduğu nazirlik və hökumət - korporativ marağı üstün tutaraq, hadisəni təcili “ört-basdır” etməyə cəhd edir və çox vaxt buna nail olurlar. İctimai qınağa səbəb olmamaq məqsədilə - “ev bizim – sirr bizim” prinsipi üstün tutulur.

Azərbaycan Respublikası Mədəniyyət Nazirliyi yanında Mədəni İrsin Qorunması, İnkişafı və Bərpası üzrə Dövlət Xidməti – elə Mədəniyyət Nazirliyinin öz strukturu olduğundan – müstəqil muzeylərə nəzarət qurumu sayıla bilməz.

Eksponatlarla bağlı fövqaladə hadisələr təkcə səhlənkarlıq nəticəsində deyil, təsadüfən, ehtiyatsızlıq ucbatından, gözlənilmədən də baş verə bilir və muzeylərimizdə belə hadisələr yəqin ki olub. Muzeylərimiz arasında öz işinə məsuliyyətlə yanaşan muzeylər əksəriyyət təşkil edirlər. Lakin, hansı muzeyimiz deyə bilər ki, biz belə fövqaladə hadisədən 100% sığortalanmışıq ?

Qəyyumlar Şurası muzey praktikasında belə faktların müəyyən olunmasında, onların ictimailəşməsində, səbəbkarın məsuliyyətə cəlb olunmasında və belə hadisənin təkrar olunmaması üçün əməli tövsiyyələr çıxarmasında iştirak edir. Qəyyumlar Şurası həm daxili – həm xarici muzey monitorinqi və məsləhət funksiyasını yerinə yetirir.

Azərbaycan muzeyləri yanında Qəyyumlar Şuralarının yaradılması muzeylərə xalq tərəfindən əmanət kimi verilmiş tarixi, bədii, maddi sərvətlərin sağ-salamat saxlanmasına əlavə sığorta olardı və belə sığortaya ehtiyac var.

Oxucu düşünə bilər ki, məsələ şişirdilib. " Xoruz bannamasa – səhər açılmaz bəyəm" ? Muzeylərimiz 100 ildir Qəyyumlar Şurasız fəaliyyət göstərir. Bu düşüncə muzeylərə Sovetlər dövründən miras qalmış yanaşmanı əks edir. Və belə yanaşma nəticəsində 100 il ərzində nə qədər muzey eksponatı məhf olaraq "silinib" – bunu Allah bilir.

Belə düşünənlərin yadına Milli İncəsənət Muzeyimizdə 1993-ci ildə baş vermiş məşhur əsər oğurluğunu yada salmaq yerinə düşər: Oğurluq hadisəsi ictimailəşdikdə belə, muzey direktoru dərhal məsuliyyətə cəlb olunmadı, o vaxtki mədəniyyət naziri isə, televizor vasitəsilə oğurlanmış əsərlərin dəyərsiz surət olmasına xalqı inandırmağa çalışırdı. Ölkə prezidenti isə, tabeliyində olan muzeydə fövqaladə oğurluq baş vermiş naziri bundan sonra hələ 13 il mədəniyyət naziri vəzifəsində saxladı !!!😉

Digər bir fakt kimi, 2015-ci ildə Milli Xalça muzeyində Hesablama Palatısının və Mədəniyyət nazirliyinin apardığı daxili yoxlamalar və onların acı nəticələri heç kimi narahat etmədimi ?

Və yenə, digər bir fakt: 2021-ci ildə Müasir İncəsənət Muzeyinin icraçı direktorunun muzey fəaliyyətinə görə cinayət məsuliyyətinə cəlb olnmasına 2-3 gün qalmış vəzifədən təcili şəkildə azad olunması faktı "ört-basdır" deyilsə - nədir ? Və bu ictimaiyyəti narahat etmirmi ?

Əlbəttə, narahat edirlər. Bu narahatlıqlara birdəfəlik son qoyulması üçün dövlət və muzey məmuru vətəndaşla əlbir olaraq, mütərəqqe dünya muzey təcrübəsindən bəhrələnərək, ölkədə güvəncli **MUZEY İŞİ** təşkil etməlidirlər.




1960 - cı illər ...



1970 - ci illər ...



2000 - ci illər ...

**3022- ci il ... ???**

Azərbaycan Milli Tarix Muzeyi binasını bir günlük belə heç vaxt tərk etməyən, eksponatın cəmi 60 il ərzində hansı vəziyyətə dəyişməsini əks edən fotolar. Muzeylərimizdə olan təşkilati problemlərin aktuallığının əyyani sübutu.